ISSN 2218-4791




AZƏRBAYCAN
MİLLİ ELMLƏR AKADEMİYASI
NAXÇIVAN BÖLMƏSİ

НАХЧЫВАНСКОЕ
ОТДЕЛЕНИЕ НАЦИОНАЛЬНОЙ
АКАДЕМИИ НАУК АЗЕРБАЙДЖАНА

NAKHCHIVAN SECTION
OF THE NATIONAL ACADEMY
OF SCIENCES OF AZERBAIJAN

# XƏBƏRLƏR

## Təbiət və texniki elmlər seriyası

AKADEMİYA

# ИЗВЕСТИЯ

## СЕРИЯ ЕСТЕСТВЕННЫХ И ТЕХНИЧЕСКИХ НАУК

# NEWS

## THE SERIES OF NATURAL AND TECHNICAL SCIENCES

2015, № 2

AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI NAXÇIVAN BÖLMƏSİNİN XƏBƏRLƏRİ
*Təbiət və texniki elmlər seriyası, 2015, № 2*

ИЗВЕСТИЯ НАХЧЫВАНСКОГО ОТДЕЛЕНИЯ НАЦИОНАЛЬНОЙ АКАДЕМИИ НАУК АЗЕРБАЙДЖАНА
*Серия естественных и технических наук, 2015, № 2*

NEWS OF NAKHCHIVAN SECTION OF AZERBAIJAN NATIONAL ACADEMY OF SCIENCES
*The series of natural and technical sciences, 2015, №2*

**MİRVASİF SEYİDOV**
Naxçıvan Dövlət Universiteti
E-mail: seyidli58mail.ru

# NAXÇIVAN MUXTAR RESPUBLİKASINDA KƏND TƏSƏRRÜFATI HEYVANLARININ *RIPICEPHALUS BURSA* NÖV GƏNƏLƏRLƏ YOLUXMASI

*Məqalədə Naxçıvan MR şəraitində kənd təsərrüfatı heyvanlarında parazitlik edən R.bursa gənələri ilə yoluxmanın ekstensivliyi və intensivliyi öz əksini tapmışdır. Naxçıvan MR-da R.bursa növ gənələrinin coğrafi zonadan asılı olaraq müxtəlif dövrlərdə inkişafının bir pik mərhələsi aşkar edilmişdir. Bu pik mərhələ aran rayonlarda aprel ayının üçüncü ongünlüyünə, dağətəyi rayonlarda, iyun ayının ikinci ongünlüyünə, dağlıq ərazilərdə isə iyun ayının birinci ongünlüyünün sonunda təsadüf edilir.*

**Açar sözlər:** *iksodofauna, gənələr, invaziya, coğrafi zona, Naxçıvan.*

Ölkəmizdə aparılan aqrar islahatlar, sahibkarlığın inkişaf dinamikasının tənzimlənməsi üçün real şərait yaratmışdır. Respublikamızın iqtisadiyyatının əsas sahələrindən olan heyvandarlığın durmadan inkişaf etdirilməsi, əhalinin heyvan mənşəli ərzaq və qeyri-ərzaq məhsullarına olan tələbatının ödənilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.

Heyvandarlığın inkişaf etdirilməsinə mane olan bir çox səbəblər vardır ki, bunların sırasında ən geniş yayılmış xəstəliklərdən biri də qan parazitar xəstəlikləridir. Hansı ki, həmin xəstəliklər nəticəsində hər il muxtar respublikada heyvandarlığın iqtisadiyyatına külli miqdarda zərər dəyir. Bu baxımdan ən çox itki başqa ölkələrdən alınıb gətirilən yüksək məhsuldarlığa malik cins iri buynuzlu mal-qara arasında müşahidə edilir. Zərər təkcə mal-qaranın xüsusən cins heyvanların tələfatı ilə nəticələnməyib, eyni zamanda xəstəlikdən sağalmış heyvanların məhsuldarlığının aşağı düşməsi və damazlıq qabiliyyətinin itirilməsi, cavanlarda boy inkişafının dayanması və. s ilə nəticələnir. Xəstəlik 60-80% faiz ölümlə nəticələnir, sağalan heyvanlarda süd məhsuldarlığı 50-70% aşağı düşür.

Haliyədə qan parazitar xəstəlikləri və onların keçiriciləri olan iksodide gənələri bütün dünya üzrə bu sahədə iş aparan tədqiqatçıların əsas tədqiqat obyektinə çevrilmişdir. Hansı ki, infeksiyon xəstəliklərdən fərqli olaraq parazitar xəstəliklərə qarşı peyvənd hazırlamaq hələdə mümkün olmamışdır. Buna görə

də, həmin xəstəliklərə qarşı mübarizə tədbirləri iksodide gənələrinin heyvanlara hücumunun qarşısını almaq istiqamətinə yönəlmişdir. Bunun üçün isə xəstəliklərə qarşı mübarizə məhdud ərazinin təbii iqlim şəraiti, həmin ərazidə xəstəliyin törədici və keçiricilərinin ətraflı öyrənilməsi və yerli şərait nəzərə alınmaqla xəstəliyə qarşı planlı mübarizə tədbirlərinin hazırlanması əsas şərtdir [ 3, s. 98-121; 4, s. 25-36].

Apardığımız araşdırmalar nəticəsində Naxçıvan Muxtar Respublikasında ən geniş yayılmış iksodide dənələrinin parazitli getmə müddətləri və mövsümilik xüsusiyyətləri aydınlaşdırılmışdır.

Bu növlərdən biri də R. bursa növ gənələridir. Bu növ muxtar respublikada dominantlıq təşkil edən növ olub, geniş ərazidə yayılmışdır. [2, s. 174-179] Heyvandarlığın iqtisadiyyatına külli miqdarda zərər vuraraq, aran zonasından yüksək dağlıq zonaya qədər hər yerdə rast gəlinir. Ən çox aran və dağətəyi rayonlarda efemer bitki örtüklü kolluq, çəmənlik və seyrək bataqlıqlardan ibarət yarımsəhra və çöllüklərdə geniş yayılmışdır.

Dağlıq ərazidə dağlıq çöllük, dağlıq-meşəlik və sıx kolluqlarda *R. bursa* növ gənəsi geniş yayılıb. Toplanmış materialların analizindən məlum olur ki, bu növə yüksək dağlıq zonalarda da rast gəlinir [1, s. 115-119].

Bir sözlə *Ripisephalus* bursa növ gənələr Naxçıvan MR-də dəniz səviyyəsindən 700-2500 m yüksəkliyə qədər olan arealda yayılmışdır. Bu növ gənələrlə heyvanların yoluxması bəzən 90%-ə çatır.

Bu baxımdan aparılan araşdırmaların nəticəsi olaraq *R. bursa* gənələrinin coğrafi qurşaqlar üzrə mövsümi parazitlik etmə müddətlərini, bu növlə mövsümdən asılı olaraq kənd təsərrüfatı heyvanlarının yoluxmasının eks- və intensivliyi müəyyən etdik (şəkil).

Şəkildən göründüyü kimi, Naxçıvan Muxtar Respublikasında kənd təsərrüfatı heyvanlarının *R. bursa* növ gənələri ilə ən yüksək yoluxması dağətəyi rayonlarda müşahidə edilir. Bu zonada *R. bursa* növ gənələrinin mart ayının sonlarından başlayaraq heyvanlara hücumu qeyd olunur. Aprel ayının birinci on günlüyünün sonunda sürü və naxırlarda yoluxma ekstensivliyi 10% təşkil edib, hər baş yoluxmuş heyvana orta hesabla 4,2 fərq gənə düşür. May ayının əvvəlində heyvanlar arasında 45-48% olmaqla, hər baş heyvana orta hesabla 9,7 fərd gənə düşür. May ayının üçüncü on günlüyündə 75% yoluxma aşkar edilməklə hər baş heyvana 16 fərq təşkil edir. İyun ayının ikinci on günlüyündə *R. bursa* növ gənələrinin heyvanlara hücumu pik səviyyəyə çatıb, əlverişli hava şəraitində heyvanlar arasında yoluxma 90%-ə çatmaqla hər baş heyvana orta hesabla 22,4 fərq düşür. Bundan sonrakı mərhələdə bu növ gənələrin təbiətdə miqdarı və yoluxma faizi tədricən enməyə başlayır. Belə ki, iyul ayının əvvəlində heyvanların yoluxması 85% təşkil etməklə, hər başa 17,1 fərd gənə düşür. Gənələrin heyvanlara hücumu getdikcə azalaraq iyul ayının birinci ongünlüyündə heyvanlar arasında yoluxma 45% olmaqla hər baş heyvana 8,2 fərd, ikinci ongünlüyündə yoluxma 15-18% olmaqla hər baş heyvana 3,7 fərd gənə düşür. Bu

22,4 fərq düşür. Bundan sonrakı mərhələdə bu növ gənələrin təbiətdə miqdarı və yoluxma faizi tədricən enməyə başlayır. Belə ki, iyul ayının əvvəlində heyvanların yoluxması 85% təşkil etməklə, hər başa 17,1 fərd gənə düşür. Gənələrin heyvanlara hücumu getdikcə azalaraq iyul ayının birinci ongünlüyündə heyvanlar arasında yoluxma 45% olmaqla hər baş heyvana 8,2 fərd, ikinci ongünlüyündə yoluxma 15-18% olmaqla hər baş heyvana 3,7 fərd gənə düşür. Bu düşmə davam edərək sentyabr ayınadək davam edir. Xəstəlik oktyabr-noyabr aylarında nadir halda qeyd olunur və yoluxma ekstensivliyi və intensivliyi nəzərə çarpacaq dərəcədə olmur.

Yoluxmanın səviyyəsinə görə ikinci yerdə aran rayonları durur. Bu zonada *R. bursa* gənələrinin aktivləşməsinə əlverişli hava şəraitində fevral ayının sonlarında təsadüf edilməklə tək-tək qeyd olunur. Mart ayının sonunda heyvanlar arasında 3%-ə qədər yoluxma aşkar olunub hər baş heyvana 1,2 fərd gənə düşür. Mart ayının sonundan aprel ayının birinci yarısınadək *R. bursa* gənələrinin təbiətdə sayı getdikcə artır və heyvanlar arasında 30-35% yoluxma aşkar olmaqla hər baş heyvana 9,6 fərq may ayının birinci ongünlüyündə yoluxma 60%-ə çatıb, hər baş heyvanda orta hesabla 14,8 fərd gənə parazitlik edir. Bu kəskin yüksəliş aprel ayının ikinci ongünlüyündə pik nöqtəyə çatır və bu zaman heyvanlar arasında 75-78% yoluxma aşkar olmaqla hər baş heyvana orta hesabla 20,7 fərd təşkil edir. Bundan sonrakı mərhələdə *R. bursa* gənələrinin aran rayonlarında qeydiyyatı aşağı düşməyə başlayır.




**Şəkil.** Naxçıvan MR-da kənd təsərrüfatı heyvanlarının zonadan asılı olaraq R.bursa növ iksodide gənələri ilə yoluxma səviyyəsi və *R. bursa* növ gənələrinin inkişaf dinamikası.

1 – aran rayonlarında

ayının ikinci yarısında 30-35% təşkil etməklə, 6,7 fərd, bu ayın sonunda isə yoluxma ekstensivliyi 20-22% olmaqla hər baş heyvana orta hesabla yoluxma intensivliyi 4,1 fərd təşkil edir.

Sonrakı aylarda onların sayı tədricən azalıb, avqust ayının əvvəlində nəzərə çarpacaq dərəcədə zəifləsə də, avqust ayının içərisində yoluxma ekstensivliyi və intensivliyi nisbətən artaraq 10%-ədək yüksəlir ki, bu vaxt hər baş heyvana təqribən 1,3 fərd gənə düşür. Bundan sonrakı mərhələdə onların sayı tədricən azalıb oktyabr ayının ikinci ongünlüyünün sonunadək seyrək halda qeyd olunurlar. Aran rayonlarında *R. bursa* gənələrinin dağətəyi rayonlara nisbətən zəif inkişafı burada istilər və quraqlıqla əlaqədardır.

Dağlıq rayonlarda *R. bursa* gənələrin inkişaf sikli digər iki rayona nisbətən daha zəifdir. Belə ki, dağlıq qurşaqda bu növ gənələrə mart ayının ikinci ongünlüyündə az-az təsadüf edilsə də , əsasən onların aktivləşməsinə aprel ayının ikinci yarısından sonra təsadüf edilir. May ayının əvvəlində dağlıq rayonlarda heyvanlar arasında *R. bursa* növ gənələrlə yoluxma 20% olmaqla, hər baş yoluxan heyvana orta hesabla 4,4 fərd gənə təşkil edir.

Bundan sonra yoluxma səviyyəsi getdikcə artıb, iyun ayının birinci ongünlüyünün sonunda pik səviyyəyə çatır və bu zaman heyvanlar arasında 48-50% yoluxma olmaqla hər baş yoluxmuş heyvana gənə sayı 8,3 fərd təşkil edir. Sonrakı aylar onların təbiətdə sayı getdikcə azalıb, iyul ayında sürünün 20%-də yoluxma olmaqla, hər baş yoluxan heyvanda 3,7 fərd aşkar oluna bilir. Bundan sonrakı dövrdə onların sayı avqust ayının ikinci ongünlüyünə qədər azalır və sentyabr-oktyabr aylarında çox az miqdarda rast gəlinir.

Yuxarıda qeyd olunanlardan belə nəticə əldə olunur ki, *R. bursa* gənələri, Naxçıvan MR-in aran, dağətəyi və dağ rayonlarında geniş yayılıb, onların inkişafı bir pik mərhələsindən ibarətdir.

*R. bursa* gənələrinin yetkin olmayan mərhələlərinə yəni sürfə və nimfalarına iyun ayının birinci ongünlüyündən sonra təsadüf etdik. Bu dövrdən avqust ayının sonunadək onların təbiətdə miqdarı getdikcə artaraq heyvanlar arasında sürfə və nimfalarla yoluxma avqust ayının sonunda 65%, yoluxmuş hər baş heyvana düşən sürfə və nimfaların sayı 19,0 fərd təşkil etmişdir.

*R. bursa* növ gənələri iribuynuzlu heyvanların piroplazmidioz, xırdabuynuzlu heyvanların babezioz, piroplazmidioz, teylerioz, anaplazmoz və atların nuttalyoz kimi xəstəliklərinin keçiriciləri olduqlarından (3) muxtar respublikada heyvandarlığın iqtisadiyyatına zərər vuran iksodide gənələrindən hesab olunmalı və onların aktivləşdiyi dövr müddətində heyvanlar 7-10 gündən bir akarasid dərmanlarla dərmanlanmalıdır.

**Nəticə**

1. Naxçıvan MR-nın iksodofaunası araşdırılarkən məlum olmuşdur ki, *R. bursa* növ gənələri muxtar respublikanın bütün coğrafi qurşaqlarında xüsusən, dağətəyi, aran və dağlıq rayonlarında geniş yayılmış növlərdəndir.

2. *R. bursa* növ gənələrinin ayrı-ayrı coğrafi qurşaqlarda parazitlik etmə müddətləri, həmçinin bu növün heyvanlara hücumunun eks- və intensivliyi müəyyən olunmuşdur.
3. Naxçıvan MR-da *R.bursa* növ gənələrinin coğrafi zonadan asılı olaraq müxtəlif dövrlərdə inkişafının bir pik mərhələsi aşkar edilmişdir. Bu pik mərhələ aran rayonlarda aprel ayının üçüncü ongünlüyünə, dağətəyi rayonlarda, iyun ayının ikinci ongünlüyünə, dağlıq ərazilərdə isə iyun ayının birinci ongünlüyünün sonunda təsadüf edilir.
4. *R. bursa* növ gənələrinin sürfə və nimfa mərhələləri iyun ayının birinci ongünlüyündən avqust ayının sonunadək heyvanlarda parazitlik edirlər.

## ƏDƏBİYYAT


1. Seyidov M.A. Naxçıvan Muxtar Respublikasının iksodofaunasında dominant gənə növləri və onların yayılması / Baytarlıq təbabəti və perspektivlər. Beynəlxalq Konfrans materialları (23-24 may 2014). Naxçıvan, 2014, s. 115-119.
2. Seyidov M.A. Naxçıvan MR-də iksodofaunanın coğrafi qurşaqlar üzrə dəyişməsi və gənələrin mövsümi parazitliketmə müddətləri / Naxçıvan MR-in maddi və mənəvi sərvətlərinin elmi əsasları: Konfrans materialları. Naxçıvan, 1993, s. 174-179.
3. Померанцев Б.И. Фауна ССР: Паукообразные иксодовые клещи. Москва, 1950, 168 с.
4. Узаков У.Я. Иксодовые клещи Узбекистана. Ташкент, 1972, 256 с.



**Мирвасиф Сеидов**


## ЗАРАЖЕННОСТЬ СЕЛЬСКОХОЗЯЙСТВЕННЫХ ЖИВОТНЫХ В НАХЧЫВАНСКОЙ АВТОНОМНОЙ РЕСПУБЛИКЕ КЛЕЩАМИ ВИДА *RIPISEPHAUS BURSA*


В статье отражена экстенсивность и интенсивность инфицированности в условиях Нахчыванской АР сельскохозяйственных животных клещами-паразитами вида *R. bursa*. Выявлено, что пиковая стадия развития клещей вида *R. bursa* в Нахчыванской АР приходится на различные периоды в зависимости от географического пояса. Пиковая стадия в низменных районах приходится на третью декаду апреля, в предгорных районах – на вторую декаду июня, а в горных зонах – на конец первой декады июня. Неполовозрелые стадии клещей вида *R. bursa* паразитируют на животных с начала июня до конца августа.



**Ключевые слова:** *иксодофауна, клещи, инвазия, географический пояс, Нахчыван.*

вторую декаду июня, а в горных зонах – на конец первой декады июня. Неполовозрелые стадии клещей вида *R. bursa* паразитируют на животных с начала июня до конца августа.

**Ключевые слова:** *иксодофауна, клещи, инвазия, географический пояс, Нахчыван.*

**Mirvasif Seyidov**

## INFECTION OF FARM ANIMALS IN NAKHCHIVAN AUTONOMOUS REPUBLIC WITH TICKS OF THE SPECIES OF *RIPISEPHAUS BURSA*

Extensiveness and intensity of infection of farm animals with ticks' parasites of the species *R. bursa* in conditions of Nakhchivan AR is reflected in the paper. It is revealed that the peak stage of development of tick species of *R. bursa* in the Nakhchivan Autonomous Republic falls on different periods depending on the geographical zone. Peak stage in low-lying areas falls on the third decade of April, in the foothills on the second decade of June, and in mountainous areas on the end of the first decade of June. Immature stages of ticks' species of *R. bursa* parasitize on animals from early June to late August.

**Key words:** *Ixodidae fauna, ticks, invasion, geographical zone, Nakhchivan.*

(*AMEA-nin müxbir üzvü Saleh Məhərrəmov tərəfindən təqdim edilmişdir*)

# MÜNDƏRİCAT

## KİMYA



## BİOLOGİYA

## FİZİKA



## ASTRONOMİYA



## İNFORMATİKA